## ELMİN FƏZİLƏTİ İLƏ ƏLAQƏLİ AYƏLƏR

شَهِدَ اللَّهُ أَنَّهُ لَا إِلَٰهَ إِلَّا هُوَ وَالْمَلَائِكَةُ وَأُولُو الْعِلْمِ قَائِمًا بِالْقِسْطِ ۚ لَا إِلَٰهَ إِلَّا هُوَ الْعَزِيزُ الْحَكِيمُ

Allah Özündən başqa heç bir İlah olmadığına şahiddir. Mələklər və elm sahibləri də haqqa ədalətlə boyun qoyaraq (haqqa tapınaraq) o qüvvət, hikmət sahibindən başqa ibadətə layiq heç bir varlıq olmadığına şəhadət verdilər.[1]

فانظر كيف بدأ سبحانه و تعالى بنفسه و ثنى بالملائكة ، و ثلث بأهل العلم، و ناهيك بهذا شرفا و فضلا و جلاء و نبلا

Göründüyü kimi ayədə Allah (subhanəhu və təalə), Ondan başqa ilah olmadığı həqiqətinə öncə öz zatını daha sonra mələkləri, üçüncü olaraq da elm sahiblərini şahid göstərməkdədir. Bu ayə, elmin və elm əhlinin ucalığını göstərən böyük bir dəlildir.[2]

قال القرطبي: في هذه الاية دليل على فضل العلم و شرف العلماء و فضلهم، فإنه لو كان أحد أشرف من العلماء لقرنهم الله باسمه واسم الملائكة كما قرن اسم العلماء

**İmam Qurtubi** (Allah ona rəhmət etsin) deyir: Bu ayədə elmin fəzilətinə, alimlərin fəzilətinə və şərəfinə dəlil vardır. Əgər alimlərdən daha şərəfli biriləri olsaydı Allah özünün və mələklərin isminin yanında onun ismini zikr edərdi.[3]

Uca Allah buyurur:

يَا أَيُّهَا الَّذِينَ آمَنُوا إِذَا قِيلَ لَكُمْ تَفَسَّحُوا فِي الْمَجَالِسِ فَافْسَحُوا يَفْسَحِ اللَّهُ لَكُمْ ۖ وَإِذَا قِيلَ انْشُزُوا فَانْشُزُوا يَرْفَعِ اللَّهُ الَّذِينَ آمَنُوا مِنْكُمْ وَالَّذِينَ أُوتُوا الْعِلْمَ دَرَجَاتٍ ۚ وَاللَّهُ بِمَا تَعْمَلُونَ خَبِيرٌ

"Ey iman gətirənlər! Sizə: “Məclislərdə (mömin qardaşlarınıza) yer verin!” – deyildiyi zaman (onlara) yer verin ki, Allah da sizə (Cənnətdə)

[1] Ali İmran 18
[2] İhyau Ulumi-d Din, c. 1, səh. 5
[3] Əl-Cəmiu li Əhkəmi-l Qur’ən, c. 4, səh. 41.

geniş yer versin. Eləcə də sizə: “Qalxın!” deyildikdə qalxın ki, Allah da sizdən iman gətirənlərin və (xüsusilə) elm bəxş edilmiş kimsələrin dərəcələrini ucaltsın. Allah etdiyiniz əməllərdən xəbərdardır!"[4]

قال ابن عباس رضي الله عنهما: للعلماء درجات فوق المؤمنين بسبعمائة درجة، ما بين الدرجتين مسيرة خمسمائة عام

**İbni Abbas** (radiyallahu anhu) bu ayətin təfsirində belə deyir: Alimlər, cahillərdən yeddi yüz dərəcə üstündür və hər dərəcə arasında beş yüz illik dərəcə vardır. [5]

Bu ayə məclislərdə, insanların yığışdığı məkanlarda elm sahiblərinin xüsusi məqamı olduğunu göstərir. Bu məsələyə diqqət etmək lazımdır. Elm sahibləri bir məclisə gəldiyi zaman onlara xüsusi ehtiram göstərmək lazımdır. Onlara göstərilən ehtiram onların hər hansısa şəxsi xüsusiyyətləri üçün yox, elm sahibi olduqları üçün olmalıdır. Bu hörməti göstərən insanda bunun Allahın buyruğu olduğunu unutmamalıdır. Bu əməli edərkən nəfsinə ağır gəlsədə etdiyinin Allah üçün olduğunu bilməlidir.

Uca Allah buyurur:

قُلْ هَلْ يَسْتَوِي الَّذِينَ يَعْلَمُونَ وَالَّذِينَ لَا يَعْلَمُونَ ۗ إِنَّمَا يَتَذَكَّرُ أُولُو الْأَلْبَابِ

De: “Heç bilənlərlə bilməyənlər (alimlə cahil) eyni ola bilərmi?! (Allahın ayələrindən, dəlillərindən) yalnız ağıl sahibləri ibrət alar!” [6]

قَالَ الزَّجَّاجُ: أَيْ كَمَا لَا يَسْتَوِي الَّذِينَ يَعْلَمُونَ وَالَّذِينَ لَا يَعْلَمُونَ كَذَلِكَ لَا يَسْتَوِي الْمُطِيعُ وَالْعَاصِي. وَقَالَ غَيْرُهُ: الَّذِينَ يَعْلَمُونَ هُمُ الَّذِينَ يَنْتَفِعُونَ بِعِلْمِهِمْ وَيَعْمَلُونَ بِهِ، فَأَمَّا مَنْ لَمْ يَنْتَفِعْ بِعِلْمِهِ وَلَمْ يَعْمَلْ بِهِ فَهُوَ بِمَنْزِلَةِ مَنْ لَمْ يعلم

**Zuccəc** deyir: Yəni necə bilənlərlə bilməyənlər bir deyil isə eyni şəkildə itaət edən ilə üsyankar kimsə də bir deyildir.

[4] Mücadələ 11
[5] İhyau Ulumi-d Din, c. 1, səh. 5
[6] Zümər 9

Başqası isə belə deyir: Bilənlər, bildiklərindən istifadə edenlər və lazımınca  əməl edənlərdir. Bildiyindən faydalanmayan və lazımınca əməl etməyən bir kimsə, bilməyən birisi mərtəbəsindədir.[7]

Bu ayə isə xüsusən elm və əməlin vəhdətinə diqqət çəkir. Yəni elm öyrəndiyi halda onu yaşamayan, elmini həyatına düstur edinməyən, eynən cahil kimidir. Bu elm sahibi olmamaqdan daha acınacaqlı haldır. Elm sahibi olmayanın əməlində bilmədiyi üçün nöqsan olur. Bu isə onun üçün qüsur olsa belə bilmədən olduğu üçün əffedilər. Amma elm sahibi əməlində nöqsan etdiyi zaman, bildiyi halda bu günahı etdiyi üçün əffedilməz.

Uca Allah buyurur:

اِنَّمَا يَخْشَى اللّٰهَ مِنْ عِبَادِهِ الْعُلَمٰٓؤُاۜ

Allahdan Öz bəndələri içərisində ancaq alimlər qorxar.[8]

يَعْنِي بِالْعُلَمَاءِ الَّذِينَ يَخَافُونَ قُدْرَتَهُ، فَمَنْ عَلِمَ أَنَّهُ عَزَّ وَجَلَّ قَدِيرٌ أَيْقَنَ بِمُعَاقَبَتِهِ عَلَى الْمَعْصِيَةِ، كَمَا رَوَى عَلِيُّ بْنُ أَبِي طَلْحَةَ عَنِ ابْنِ عَبَّاسٍ" إِنَّما يَخْشَى اللَّهَ مِنْ عِبادِهِ الْعُلَماءُ" قَالَ: الَّذِينَ عَلِمُوا أَنَّ اللَّهَ على كل شي قَدِيرٌ. وَقَالَ الرَّبِيعُ بْنُ أَنَسٍ: مَنْ لَمْ يَخْشَ اللَّهَ تَعَالَى فَلَيْسَ بِعَالِمٍ. وَقَالَ مُجَاهِدٌ: إِنَّمَا الْعَالِمُ مَنْ خَشِيَ اللَّهَ عَزَّ وَجَلَّ. وَعَنِ ابْنِ مَسْعُودٍ: كَفَى بِخَشْيَةِ اللَّهِ تَعَالَى علما وبالاغترار جهلا. وقيل لسعد ابن إِبْرَاهِيمَ: مَنْ أَفْقَهُ أَهْلِ الْمَدِينَةِ؟ قَالَ أَتْقَاهُمْ لِرَبِّهِ عَزَّ وَجَلَّ. وَعَنْ مُجَاهِدٍ قَالَ: إِنَّمَا الْفَقِيهُ مَنْ يَخَافُ اللَّهَ عَزَّ وَجَلَّ. وَعَنْ عَلِيٍّ رَضِيَ اللَّهُ عَنْهُ قَالَ: إِنَّ الْفَقِيهَ حق الفقيه من لم يقنط النَّاسَ مِنْ رَحْمَةِ اللَّهِ، وَلَمْ يُرَخِّصْ لَهُمْ فِي مَعَاصِي اللَّهِ تَعَالَى، وَلَمْ يُؤَمِّنْهُمْ مِنْ عَذَابِ اللَّهِ، وَلَمْ يَدَعِ الْقُرْآنَ رَغْبَةً عَنْهُ إِلَى غَيْرِهِ، إِنَّهُ لَا خَيْرَ فِي عِبَادَةٍ لَا عِلْمَ فِيهَا، وَلَا عِلْمَ لَا فِقْهَ فِيهِ، وَلَا قِرَاءَةَ لَا تَدَبُّرَ فِيهَا

**İmam Qurtubi** ayə haqqında deyir: Bu buyruq ilə, Allah'ın qüdrətindən qorxan elm adamları nəzərdə tutulur. Uca Allah'ın hərşeyə qadir olduğunu bilən birisi günah səbəbiylə cəzalandırılacağına da yəqinən inanar. Necəki Əli ibn Əbi Talha, İbn Abbas'dan uca Allah'ın: "Qulları arasında Allah'dan ancaq alimlər qorxar" buyruğu haqqında belə dediyini rəvayət etməkdədir: Bunlar uca Allah'ın hərşeyə qadir olduğunu bilən kimsələrdir.

[7] Əl-Cəmiu li Əhkəmi-l Qur'ən, c. 15, səh. 239.
[8] Fatir 28

**Rabî' ibn Ənəs** dedi ki: Allah'dan qorxmayan bir kimsə alim deyildir. Mücahid də belə demişdir: Alim ancaq Allah'dan qorxan kimsədir. İbn Məs'ud'dan da belə dediyi nəqledilmişdir: Elm olaraq uca Allah'tan qorxmaq, cahillik olaraq da qürura qapılmaq yetərlidir.

**Sa'd ibn İbrahim'ə**: Mədinəlilərin ən fəqihi kimdir? Deyə soruşulmuş, o da: Aralarından Rəbblərinə qarşı ən çok taqvəlı olanlarıdır, deye cavab vermişdir.

Yenə **Mücahid'dən** belə dediyi nəqledilmişdir: Fəqih (dində dərin bilgi sahibi) ancaq uca Allah'dan qorxan kimsədir.

**Əli** (radiyallahanhu)'dan da belə dediyi nəqledilmişdir: Həqiqi mənası ilə fəqih, insanlara Allah'ın rəhmətindən ümid kəsdirtməyən, Allah'a üsyan etmeləri üçün onlara rüxsətlər tapmayan, Allah'ın əzabından əmin olmalarına səbəb təşkil etməyən, başqasına duyduğu arzu səbəbiylə Qur'ân'dan üz çevirməyən kimsədir. Çünki elmsiz ibadətdə xeyr olmadığı kimi, fiqh (fəhm) olmayan elmdə xeyr yoxdur, tədəbbürü olmadan da qiraət (Qur'ân oxumaq) olmaz.[9]

الزَّمَخْشَرِيُّ: فَإِنْ قُلْتَ: فَمَا وَجْهُ قِرَاءَةِ مَنْ قَرَأَ" إِنَّمَا يَخْشَى اللَّهُ" بِالرَّفْعِ" مِنْ عِبادِهِ الْعُلَماءُ" بِالنَّصْبِ، وَهُوَ عُمَرُ بْنُ عَبْدِ الْعَزِيزِ. وَتُحْكَى عَنْ أَبِي حَنِيفَةَ. قُلْتُ: الْخَشْيَةُ فِي هَذِهِ الْقِرَاءَةِ اسْتِعَارَةٌ، وَالْمَعْنَى: إِنَّمَا يُجِلُّهُمْ وَيُعَظِّمُهُمْ كَمَا يُجَلُّ الْمَهِيبُ الْمَخْشِيُّ مِنَ الرِّجَالِ بَيْنَ النَّاسِ مِنْ بَيْنِ جَمِيعِ عِبَادِهِ

**Zəməxşəri** deyir: "Allah'dan ancaq qulları arasında alimlər qorxar" buyruğunda geçən "Allah" ləfzinin raf ilə "alimlər" mənasındaki ləfzi də nasb ilə oxuyanın (bu Ömer bin Abdulaziz'dir, Əbu Hənifə'nin də belə oxuduğu nəqledilmişdir) qiraətinin izahı nədir? Deyə soruşsan, belə cavab verərəm: Bu oxunuşdaki "xaşyət (qorxmaq)" istiarədir. Mənası da: İnsanlar arasında heybətli və qorxulan kimsələrə necə təzim edilirsə, uca Allah da bütün qulları arasından belələrini seçər və onları ucaldar.[10]

Ayədə bəhs edilən elmdən məqsəd insanın ömrünü sərf edərək öyrəndiyi elm deyildir. Ayədə nəzərdə tutulan elm insanın Rəbbini, nəbisini və dinini bilməsidir. Qul Rəbbini haqqı ilə tanısa, Onun Qüdrətinin əzəmətindən, qəzəbinə düçar olmaqdan qorxar. Bu

[9] Əl-Cəmiu li Əhkəmi-l Qur'ən, c. 14, səh. 343
[10] Əl-Cəmiu li Əhkəmi-l Qur'ən, c. 14, səh. 344

səbəblə nəbisinin öyrətdiyi dini yaşayaraq Rəbbinin mükafatını qazanmağa çalışar. Allahın qulları arasında ən təqvalı olan insanlarda bu xüsusiyyətləri daşıyanlardır.

Uca Allah buyurur:

وَيَقُولُ الَّذِينَ كَفَرُوا لَسْتَ مُرْسَلاًۜ قُلْ كَفٰى بِاللّٰهِ شَهِيداً بَيْنِي وَبَيْنَكُمْۙ وَمَنْ عِنْدَهُ عِلْمُ الْكِتَابِ

(Ya Rəsulum!) Kafirlər: “Sən peyğəmbər deyilsən!” – deyirlər. (Onlara) belə cavab ver: “Mənimlə sizin aranızda (doğruluğuma) Allahın və kitabı bilənlərin (Tövratı, İncili bilən mömin yəhudi və xaçpərəstlərin, yaxud Qurana bələd olan mömin müsəlmanların və ya lövhi-məhfuzdan xəbərdar olan Cəbrailin) şahid olması yetər!”[11]

Bu ayədə uca Rəbbimiz bizlərə nəbisinə şahid olaraq elm sahiblərini seçməsini deyir. Elm sahiblərini Allah bu ayədə də ucaldır. Elm sahiblərin ucaldıldığı ayələr kifayət qədər çoxdur. Bu ayədə onlardan birisidir.

Uca Allah buyurur:

قَالَ الَّذِي عِنْدَهُ عِلْمٌ مِنَ الْكِتَابِ اَنَا۬ اٰتِيكَ بِهٖ قَبْلَ اَنْ يَرْتَدَّ اِلَيْكَ طَرْفُكَۜ فَلَمَّا رَاٰهُ مُسْتَقِراًّ عِنْدَهُ قَالَ هٰذَا مِنْ فَضْلِ رَبِّيْ لِيَبْلُوَنِي ءَاَشْكُرُ اَمْ اَكْفُرُۜ وَمَنْ شَكَرَ فَاِنَّمَا يَشْكُرُ لِنَفْسِهٖۚ وَمَنْ كَفَرَ فَاِنَّ رَبِّي غَنِيٌّ كَرِيمٌ

(Süleyman taxtın daha tez gətirilməsini istədi). Kitabdan (Allahın kitabından, yaxud lövhi-məhfuzdan) bir qədər xəbəri olan birisi (Cəbrail, yaxud Xızır və ya Süleymanın çox ağıllı və tədbirli vəziri Asəf ibn Bərxiya) dedi: “Mən onu sənə bir göz qırpımında (gözünü yumub açınca) gətirərəm!”[12]

Kitabdan elmə sahib olan kəs, elmin nələrə qadir olduğunu göstərmək üçün Süleymana (aleyhissalam) belə xitab etmişdir:

[11] Rad 43
[12] Nəml 40

وَقَالَ الَّذِينَ اُو۫تُوا الْعِلْمَ وَيْلَكُمْ ثَوَابُ اللّٰهِ خَيْرٌ لِمَنْ اٰمَنَ وَعَمِلَ صَالِحاًۚ وَلَا يُلَقّٰيهَٓا اِلَّا الصَّابِرُونَ

Elm verilmiş kəslər isə belə dedilər: “Vay halınıza! (Ay yazıqlar!) İman gətirib yaxşı əməl edən kimsə üçün Allahın mükafatı (təmənnasında olduğunuz var-dövlətdən, dəbdəbədən) daha yaxşıdır. Buna (bu nemətə) yalnız səbr edənlər (Allaha itaət və ibadət etməyi fani dünya malından üstün tutanlar, həyatın çətinliklərinə dözənlər) qovuşarlar!”[13]

بين ان اعظم قدر الاخرة يعلم بالعلم

**İmam Ğazzali** deyir: Allah (subhənəhu və təalə) bu ayətdə axirətin qiymətinin ancaq elm ilə bilinəcəyini bəyan etmişdir.[14]

Allah İmam Ğazzaliyə rəhmət etsin, necə də gözəl demişdir. Allah ancaq axirətin dəyərinin elm ilə bilinəcəyini demişdir. Çünki elm Allahın insanlara nemət olaraq verdiyi ağıl ilə birləşdiyi zaman insan axirətə həqiqi şəkildə iman gətirər. Axirətə tam iman gətirən birisi isə imanın dadını və şirinliyini hissedər.

Uca Allah buyurur:

وَتِلْكَ الْاَمْثَالُ نَضْرِبُهَا لِلنَّاسِۚ وَمَا يَعْقِلُـهَٓا اِلَّا الْعَالِمُونَ

"Biz bu məsəlləri insanlar üçün çəkirik. Onları yalnız (haqqı) bilənlər anlayarlar."[15]

[13] Qasas 80
[14] İhyau Ulumi-d Din, c. 1, səh. 5.
[15] Ənkəbut 43

كَمَا رَوَى جَابِرٍ عَنِ النَّبِيِّ صَلَّى اللّٰهُ عَلَيْهِ وَسَلَّمَ أَنَّهُ قَالَ:" الْعَالِمُ مَنْ عَقَلَ عَنِ اللّٰهِ فَعَمِلَ بطاعته واجتنب سخطه

Cabir, Peyğəmbərin (sallallahu aleyhi və səlləm) belə buyurduğunu rəvayət etmişdir: "Âlim, Allah'dan gələnləri ağlı ilə qavrayaraq, O'na itaət ilə əməl edən, O'nu qəzəbləndirən şeylərdən də çəkinəndir.[16]

Cabirin dediyi bu söz eyni ilə alim sözünün tərifidir. Alim deyildiyi zaman bu xüsusiyyətləri daşıyan insanlar qəsd edilməlidir. Sadəcə çoxlu kitab bilgisi almaq, mətnlər əzbərləmək alim olmaq üçün kifayət deyildir. Necə ki zamanəmizdə kitab bilgisi olduğu halda insanları səhv yollara çəkənlər, alim olaraq isimləndirilməməlidirlər. Onlara alim demək, xüsusi bir şərəf ordeni hədiyyə etmək kimidir. Onlara verilən ad sacədə Həcc surəsində buyurulduğu kimi kitab yüklü uzunqulaqlardır.

Uca Allah buyurur:

وَاِذَا جَٓاءَهُمْ اَمْرٌ مِنَ الْاَمْنِ اَوِ الْخَوْفِ اَذَاعُوا بِهٖۜ وَلَوْ رَدُّوهُ اِلَى الرَّسُولِ وَاِلٰٓى اُو۬لِي الْاَمْرِ مِنْهُمْ لَعَلِمَهُ الَّذ۪ينَ يَسْتَنْبِطُونَهُ مِنْهُمْۜ وَلَوْلَا فَضْلُ اللّٰهِ عَلَيْكُمْ وَرَحْمَتُهُ لَاتَّبَعْتُمُ الشَّيْطَانَ اِلَّا قَل۪يلاً

"Onlara (münafiqlərə bəzi müsəlmanların sadəlövhlüyü üzündən döyüş meydanından) əmin-amanlıq və ya qorxu xəbəri gəldikdə dərhal onu yayarlar. Halbuki əgər (müsəlmanlar) bunu (münafiqlərə deyil), Peyğəmbərə və ya özlərindən (möminlərdən) olan ixtiyar (əmr) sahiblərinə demiş olsaydılar, əlbəttə, həmin xəbəri onun mahiyyətinə varan (belə bir xəbərin yayılmasının məqsədəuyğun olub-olmadığını təyin etməyə qadir olan) kimsələr bilərdilər. Əgər Allahın lütfü (mərhəməti) üzərinizdə olmasaydı, şübhəsiz ki, az bir qisminiz müstəsna olmaqla, Şeytana uyardınız."[17]

[16] Əl-Cəmiu li Əhkəmi-l Qur'ən
[17] Nisa 83

رد حكمه في الوقائع إلى الاستنباطهم و ألحق رتبتهم برتبة الانبياء في كشف حكم الله

Allah (subhənəhu və təalə) bu ayədə hadisələrin təhlilini alimlərin istixrac və istinbatına buraxmaqdadır. Beləcə alimlərin mərtəbələrinin uca olduğunu və peyğəmbərlərdən sonra gəldiyini bildirməkdədir.[18]

Uca Allah buyurur:

يَا بَنِي آدَمَ لاَ يَفْتِنَنَّكُمُ الشَّيْطَانُ كَمَا أَخْرَجَ أَبَوَيْكُم مِّنَ الْجَنَّةِ يَنزِعُ عَنْهُمَا لِبَاسَهُمَا لِيُرِيَهُمَا سَوْءَاتِهِمَا إِنَّهُ يَرَاكُمْ هُوَ وَقَبِيلُهُ مِنْ حَيْثُ لاَ تَرَوْنَهُمْ إِنَّا جَعَلْنَا الشَّيَاطِينَ أَوْلِيَاء لِلَّذِينَ لاَ يُؤْمِنُونَ

"Ey Adəm oğulları! Şeytan, əcdadınızın ayıb yerlərini özlərinə göstərmək məqsədilə (aldadaraq) libaslarını soyundurub Cənnətdən çıxartdığı kimi, sizi də aldatmasın. Şübhəsiz ki, o və onun nəsli sizləri sizin onları görə bilmədiyiniz yərlərdən görürlər. Həqiqətən, Biz, şeytanları iman gətirməyənlərin dostları etdik."[19]

Bəzi müfəssirlər ayədə keçən övrət yerini örtən paltar ilə elmin, zinət ilə yəqin mərtəbəsinin, təqva libası ilə də həyanın qəsd edildiyini demişlərdir.

Uca Allah buyurur:

وَلَقَدْ جِئْنَاهُمْ بِكِتَابٍ فَصَّلْنَاهُ عَلٰى عِلْمٍ هُدًى وَرَحْمَةً لِقَوْمٍ يُؤْمِنُونَ

"Həqiqətən, Biz onlara (Məkkə müşriklərinə və kafirlərinə) elmlə müfəssəl izah etdiyimiz, inanan bir qövm üçün hidayət və mərhəmət olan (dini vəzifələrini öyrətmək üçün mükəmməl) bir Kitab (Quran) gətirdik."[20]

[18] İhyau Ulumi-d Din, c. 1, səh. 5
[19] Əraf 27
[20] Əraf 52

Uca Allah yenə buyurur:

فَلَنَقُصَّنَّ عَلَيْهِمْ بِعِلْمٍ وَمَا كُنَّا غَائِبِينَ

"Sonra da onlara (nə etdiklərini) bildiyimiz üçün (hamısını bir-bir) söyləyəcəyik. Axı Biz qaib deyildik (onların yanındaydıq)."[21]

بَلْ هُوَ اٰيَاتٌ بَيِّنَاتٌ فِي صُدُورِ الَّذِينَ اُوتُوا الْعِلْمَۜ وَمَا يَجْحَدُ بِاٰيَاتِنَٓا اِلَّا الظَّالِمُونَ

"Xeyr, bu (Quran) elm verilmiş kəslərin sinələrində (əzbər) olan açıq-aydın ayələrdir. (Və ya: sənin yazıb oxumaqla məşğul olmadığını kitab əhlindən olan elm sahibləri öz ürəklərində açıq-aşkar bilirlər). Bizim ayələrimizi yalnız zalımlar (kafirlər) inkar edərlər."[22]

خَلَقَ الْاِنْسَانَۙ. عَلَّمَهُ الْبَيَانَ

İnsanı yaratdı. Ona danışmağı (fikrini və duyğularını bəyan etməyi) öyrətdi.[23]

Zikretdiyimiz ayələrdə elmin fəzilətinə kifayət qədər dəlil vardır. Elm elə bir nurdur ki, ancaq ona sahib olanları ucaldar. Onu tərk edənləri isə rəzil edər. Lakin burada diqqət çəkilməsi vacib olan çox ciddi bir məsələ vardır. Elm nurdur ancaq onunla əməl edənə fayda və ucalıq verər. Əgər onunla əməl edilməzsə bu nurun insana heç bir faydası olmaz. Bu dövrümüzün ən ciddi problemlərindən birisidir. Elm insanlara ancaq münazirə və cədəl zamanı maraqlı gəlir. Kitab oxumaq, dərs almaq, dərs dinləmək kimi elmin əsas öyrənmə yollarına gəldikdə bu insanlara sıxıcı gəlir və insanlar bundan qaçmağa çalışırlar. Əgər normal elm əldə etmə yolları bir insana ağır gəlirsə münazirələrdən əldə edəcəyi elmin ona heç bir faydası olmaz. Münazirələr insana elm yox daha çox gürur və kibir hissi verir. Bizə lazım olan isə Uca Rəbbimizin bildirdiyi elmi əldə etmək və Allaha yaxınlaşmaq üçün öyrəndiyimiz elmlə əməl etməkdir. Bundan sonra isə dəvət yolu gəlir

---

[21] Əraf 7
[22] Ənkəbut 49
[23] Rəhman 3-4

ki, buda özlüyündə məşəqqətli yoldur. Bu yola səbr etmək və bu yolda müvəffəq olmaq üçün ancaq əməl lazımdır. Əgər elmi olan onunla əməl etmədən dəvətə başlayarsa o zaman müvəffəq olması mümkün deyildir. Hər halda hansı İslamı çalışmadan danışsaq fərq etməz, mütləq əməl olmalıdır ki, müvəffəqiyyət olsun. Bu düstur üzərə elmə başlamaq lazımdır. Elm fərqli düşüncədə olan bir gruba rəddiyə vermək üçün, münazirə üçün, məşhur olmaq üçün öyrənilməz. Elm sadəcə Allaha yaxınlaşmaq üçün öyrənilər.

## ELMİN FƏZİLƏTİ İLƏ ƏLAQƏLİ HƏDİSLƏR

فقال رسول الله صلى الله عليه و سلم: من يرد الله به خيرا يفقهه في الدين و يلهمه رشده

Rəsulullah (səllallahu əleyhi və səlləm) belə buyurmuşdur: Allah (subhanəhu və təalə) bir qulu üçün xeyri murad etdiyində, onu dində fəqih bir alim edər. Ona özünü doğru yola aparacaq ağıl və idrak verər.[24]

Fəqihlik (dində fəhm sahibi olmaq) Allahın quluna verdiyi ən böyük nemətlərdəndir. Elə insanlar varki, elm sahibi olurlar amma o elm ilə doğru fətva verəcək fəhm sahibi olmurlar. Vaqiələri, hadisələri düzgün təsbit edəbilmədikləri, doğru fəhm ilə anlamadıqları üçün fətvalarıda yalnış olur. Bu hal zamanımızda daha çox görünür.

العلماء ورثة الانبياء

Alimlər, peyğəmbərlərin varisləridir.[25]

و معلوم أنه لا رتبه فوق النبوة و لا شرفة فوق شرف الوارثة لتلك الرتبة

Peyğəmbərlik dərəcəsindən daha üstün bir dərəcənin olmadığı hər kəsə məlumdur. Belə bir mərtəbəyə varis olmaqda şərəflərin ən böyüyüdür.[26]

يستغفر للعالم ما في السموات و الارض

Yerdə və Göydə olanların hamısı alim bir kimsənin əfv edilməsi üçün Allaha yalvarar.[27]

[24] Buxari və Muslim Muaviyədən, Tirmizi və İmam Əhməd İbni Abbasdan, İbni Məcə isə Əbu Hureyradan rəvayət etmişdir.
[25] Əbu Davud, Tirmizi, İbni Məcə və İbni Hibban Əbu Dərdadan rəvayət etmişlərdir.
[26] İhyau Ulumi-d Din, c. 1, səh. 5.
[27] İraqi bu hədisi daha öncəki hədisin davamı olaraq qəbul etməkdədir.

أي منصب يزيد على منصب من تشتغل ملائكة السموات و الارض بالاستغفار له

Alim, öz işləri ilə məşğulkən yer və göy əhli də onun əfvi üçün istiğfar etməklə məşğuldurlar. İnsanoğlu üçün bundan daha böyük bir şərəf düşünülə bilərmi?[28]

Bu iki hədis elmin və alimliyin fəzilətini göstərmək üçün kifayətdir. Bu iki hədis belə oxuyanı elmə təşviq etmək üçün kifayətdir. İnsan ömrü boyu tövbə edərək yaşayır ki Allah onun günahlarını bağışlasın. Alim isə oturduğu yerdən istiğfara nail olur.

إن الحكمة تزيد الشريف شرفا ترفع المملوك حتى يدرك مدارك الملوك

Şübhəsiz hikmət, insanın şərəfinə şərəf qatar. Kölələri, sultanların səviyəsinə yüksəldər.[29]

و قد نبه بهذا على ثمراته في الدنيا و معلوم أن الآخرة خير و أبقى

Rəsulullah (səllallahu aleyhi və səlləm) "kölələri sultanların səviyəsinə yüksəldər" buyuraraq elmin, bu dünyadakı səmərələrinə diqqət çəkmişdir. Bəs axirətdə? Heç şübhəsiz elmin dünyada qazandırdıqları axirətdəkilərə nisbətdə bir heç hökmündədir. Çünki axirət, həm dünyadan sayısız dərəcələrlə üstündür, həm də əbədidir.[30]

Bəli… Elmin axirətdə insana qazandırdıqları dünyada qazandırdıqlarından qat qat çoxdur. Elm insanı ucaldar. Tarix bunun misalları ilə doludur. Bu günə qədər adı şərəflə gələnlərin hər biri elmlə ucaldılmışdır.

خصلتان لا يكونان في منافق حسن سمت وفقه في الدين

İki xislət vardır ki, bu xislətlər münafiqdə olmaz. Birincisi gözəl əxlaq, ikincisi dində dərin bilgi (fiqh) sahibi olmaq.[31]

---

[28] İhyau Ulumi-d Din, c. 1, səh. 5.
[29] Əbu Nuaym Hilyədə, İbn Əbdulbərr Bəyanu-l ilmdə, Abdulğani əl- Əzdi Ədəbu-l Muhəddisdə Ənəsdən zəif sənətlə rəvayət etmişlərdir.
[30] İhyau Ulumi-d Din, c. 1, səh. 5.
[31] Tirmizi Əbu Hureyradan rəvayət etmiş və hədisin ğarib olduğunu demişdir.

و لا تشكن في الحديث لنفاق بعض فقهاء الزمان فإمه ما أراد به الفقه الذي ظننته و سيأتي معنى الفقه و أدنى درجات الفقيه أن يعلم أن الآخرة خير من الدنيا و هذه المعرفة إذا صدقت و غلبت عليه برئ بها من النفاق و الرياء

Zamanımızdakı bəzi fəqihlərin münafiqliyi, səni bu hədis haqqında şübhəyə salmasın! Allah Rəsulu, zamanımızdakı mənası ilə fəqihlərdən bəhs etmir. Onun qəsd etdiyi fiqh, zamanımızda mənasından çox uzaqdır. Fiqhin mənası Allahın izni ilə irəlidə açıqlanacaqdır. Fiqhin ən düşük dərəcəsi, axirətin dünyadan daha xeyirli olduğunu bilib bu həqiqətə görə hərəkət etməkdir. Fəqihdə bu vəsf olduğu təqdirdə bilgiləri doğru olar. Üzərindən hər cür riya halı qalxar və nifaq təhlükəsindən qurtular.[32]

İmam Ğazzalinin hədisə verdiyi izah isə zamanımızda elm əhli kimi tanınan insanların halını çox gözəl açıqlayır. Bu hal insanı hüzünləndirir. Çünki elm öyrənmək ən şərəfli işlərdəndir. Elə bir zaman var idi ki, elm sahibləri istisnasız şərəfli və dəyərli insanlar olaraq qəbul edilirdilər. Ancaq bəzi münafiqlərin halı artıq elmə və onun əhlinə zəllə salmış oldu. İnsanlar artıq elm əhlinin sözünə etibar etməməyə və elm əhlinə hörmət göstərməməyə başladılar. Belə olduğu zamanda cahillər irəli keçərək idarəni əldə tutmağa, söz sahibi olmağa başladılar. Alimlər kənarda qaldı, cahillər isə fətva verdilər. Alimlər pislənər oldu, cahillər isə tərifləndilər. Cahillər alimlərə rəddiyə verərək, onları cahilliklə ittiham etməyə başladılar. Bu hal zamanımızda İslam ümmətinin acizliyini göstərir. At izinin it izinə qarışdığı bu zamanda diqqətli olmaq və alim ilə cahili birbirindən ayırmaq lazımdır.

Burada bir məsələyə daha toxunmaq istərdim. Yaşadığı məkanda elm əhlindən icazə almadan dərs verənlərin heç birinə etibar etməyin. Onların elmi səviyyəsini təyin edən olmalıdır ki, faydası vəya zərəri bilinsin. Elm əhli bəlkədə bu kimi insanlar ilə qarşılaşsa heç birinə salam belə verməz nəinki icazə. İcazənin əhəmiyyəti odur ki, icazə alan insan daha çox etibar sahibi olur. Elm əhlinin icazə verməsi vaizlərin dəyərini və etibarlı olduqlarını göstərir.

Yenə bir məsələyə daha toxunmaq istəyirəm. Vaizləri və elm əhlinidə birbirindən fərqləndirmək lazımdır. Vaiz sadəcə insanlara

---

[32] İhyau Ulumi-d Din, c. 1, səh. 5.

ümumi dini bilgiləri danışan və insanları islama dəvət edəndir. Amma fətva vermək, hökm məsələlərinə girmək elm əhlinin işidir. Bəzən görürük ki, vaizlər hökm məsələlərinə girirlər. Haram, halal, iman və küfr məsələlərində təyinatlar bildirirlər. Halbuki müqəllid birisinin bu şəkildə təyinatlar bildirməsi doğru deyildir. Eyni ilə ərəbcə və usul dərsləri almayan bu barədə icazəsi olmayan insanların fətva verməsləri, fətva nəql etmələri caiz deyildir. Çünki ərəbcə və usul dərsləri almayanlar fətvaları adətən qaynağından deyil tərcüməsindən oxuyullar. Tərcüməsindən bir şeyi həqiqət kimi nəql etmək vəya ona uyğun fətva vermək isə caiz deyildir. Bunlar önəmli məsələlərdir. Əsasəndə işlərin qarışması, bir bölgədə fitnənin çıxması bu tip insanların elmsizcə verdiyi fətvalara görədir.

أفضل الناس المؤمن العلم الذي إن احتيج اليه نفع و إن استغنى عنه أغنى نفسه

İnsanların ən fəzilətlisi ona ehtiyac olduğunda insanlara kömək edən ehtiyac olmadığında isə elmi ilə yetinərək vüqarlı olan mömin alimdir.[33]

İndi isə alimlərin olmadığı bölgədə elm tələbələri və vaizlər tərəfindən görülməsi vacib olan işlərə diqqət edək. Alimlərin olmadığı bölgədə onların mövzular haqqında verdiyi fətvaları nəql etmək, kitablarını tərcümə edib insanları aydınlatmaq elm tələbələrinin işidir. Vaizlərin işi isə elm tələbələrinin icazəsi və köməyi ilə bu dəvəti insanlara haqqı ilə çatdırmaqdır. Elm tələbələrinin və vaizlərin köməkləşərək edəcəkləri bu  dəvət işi həmin bəldə də hədisə uyğun olaraq ehtiyacı qarşılamaqdır. Həqiqi elm sahibləri bu işin yükünü bildiyi üçün bu işlərə girməyə can atmır. Ancaq zərurət onları buna məcbur edir.

الايمان عريان و لباسه التقوى و زينته الحياء و ثمرته العلم

İman lütfdür, paltarı təqva, zinəti həya və meyvəsi elimdir.[34]

---

[33] Beyhəqi Şuabu-l İmanda Əbu Dərdadan zəif istinadla rəvayət etmişdir.
[34] Hakim, Nişabur tarixində Əbu Dərdadan rəvayət etmiş, hədisin istinadının zəif olduğunu demişdir.

أقرب الناس من درجة النبوة أهل العلم و الجهاد أما أهل العلم فدلوا الناس على ما جائت به الرسل و أما أهل الجهاد فجاهدوا بأسيافهم على ما جائت به الرسل

İnsanlar arasında peyğəmbərlik məqamına ən yaxın olan kimsələr, elm və cihad əhli olanlardır. Çünki alimlər xalqı, Peyğəmbərlərin gətirdiyi haqqa yönləndirərlər. Mücahidlər isə Peyğəmbərlərin gətirdiyi bu ilahi nizamı qılınclarıyla qorumaq üçün cihad edərlər.[35]

لموت قبيلة أيسر من موت عالم

Bir qəbilənin ölümü, bir alimin ölümündən əhvəndir (daha yüngül).[36]
Çünki alimin ölümü həmin bölgənin cahələtə doğru getməsidir. Bu isə həmin yerdə nizamın pozulması deməkdir. Əgər bir bölgədə nizam pozularsa, o yerin insanları həlak olar.

الناس معادن كمعادن الذهب و الفضة فخيارهم في الجاهلية خيارهم في الاسلام اذا فقهوا

İnsanlar, qızıl və gümüş kimi fərqli mədənlərə bənzəyirlər. Dində fəqih olmaq şərtiylə cahiliyə dövründə xeyirli olanları, İslama girdikdən sonrada ən xeyirliləridir.[37]

يوزن يوم القيامة مداد العلماء بدم الشهداء

Qiyamət günündə alimlərin mürəkkəbi şəhidlərin qanı ilə ölçülər.[38]

من حفظ على امتي أربعين حديثا من السنة حتى يؤديها إليهم كنت له شفيعا و شهيدا يوم القيامة

Ümmətimə çatdırmaq üzərə qırx hədis əzbərləyən kimsəyə qiyamət günündə həm şəfaətçi, həmdə şahid olaram.[39]

---

[35] Əbu Nuaym, İbni Abbas dan zəif istinadla, ayrıca Əbu Talib əl-Məkki də Muaz ibn Cəbəldən rəvayət etmişdir.
[36] Təbərani və ibni Əbdulbərr, Əbu Dərdadan rəvayət etmişlərdir.
[37] Buxari və Muslim, Əbu Hureyradan rəvayət etmişlərdir.
[38] İbni Əbdulbərr, Əbu Dərdadan zəif bir sənədlə rəvayət etmişdir.
[39] İbni Əbdulbərr, İbni Ömərdən zəyif bir sənədlə rəvayət etmişlərdir.

من تفقه في دين الله عز و جل كفاه الله تعالى ما أهميه ورزقه من حيث لا يحتسب

Allah (subhənəhu və təalə) dinini dərinliyinə qavrayan kimsəyi qoruyar və ummadığı yerdən ona ruzi verər.[40]

أوحى الله عز و جل إلى إبراهيم عليه السلام يا إبراهيم إني عليم احب كل عليم

Allah (subhənəhu və təalə) İbrahimə (əleyhissalam) Ey İbrahim! Mən aliməm və alim olan hər qulumu sevərəm deyə vəhy etmişdir.[41]

العالم أمين الله سبحانه في الأرض

Alim, Allahın (subhanəhu təalə) yer üzündəki əmin quludur.[42]

صنفان من أمتي إذا صلحوا صلح الناس و إذا فسدوا فسد الناس الامراء و الفقهاء

Ümmətimdən iki sinif vardır. Onlar islah olarsa hərkəs islah olar. Onlar ifsad olarsa hərkəs ifsad olar. Bunlar idarəçilər və alimlərdir.[43]

إذا أتى علي يوم لا أزداد فيه علما يقربني إلى الله عز و جل فلا بورك لي في طلوع شمس ذلك اليوم

Məni Allaha (subhənəhu və təalə) yaxınlaşdıracaq yeni bilik əldə etmədiyim günün heç bir xeyri yoxdur.[44]

فضل العالم على العابد كفضلي على أدنى رجل من أصحابي

Alimin abidə olan üstünlüyü mənim əshabımın ən düşük dərəcəlisinə olan üstünlüyüm kimidir.[45]

---

[40] Xatib əl Bəğdadi
[41] İbn Əbdulbərr müəlləq olaraq rəvayət etmişdir. İraqi bu hədisin sənədinə rastlamadığını demişdir.
[42] İbni Əbdulbərr Muaz ibn Cəbəldən rəvayət etmişdir.
[43] İbni Əbdulbərr və Əbu Nuaym İbni Abbasdan rəvayət etmişlərdir.
[44] Təbərani və Əbu Nuaym, Aişədən rəvayət etmişlərdir.
[45] Tirmizi, Əbu Umamədən rəvayət etmiş, hədisin həsən və səhih olduğunu demişdir.

فضل العالم على العابد كفضل القمر ليلة البدر على سائر الكواكب

Alimin abidə olan üstünlüyü bədrin digər ulduzlara olan üstünlüyü kimidir.[46]

يشفع يوم القيامة ثلاثة الانبياء ثم العلماء ثم الشهداء

Qiyamət günü üç sinif insan şəfaət edəbiləcəkdir: Peyğəmbərlər, alimlər və şəhidlər.[47]

فأعظم بمرتبة هي تلو النبوة و فوق الشهادة مع ما ورد في فضل الشهادة

Şəhidliyin fəziləti haqqında gələn rəvayətlərə baxmayaraq, elmin nübuvvət məqamının ardınca zikr edilib, şəfaət haqqının peyğəmbərlərdən sonra alimlərə verilməsi onlar üçün necədə böyük bir nemətdir.[48]

ما عبد الله تعالى بشيء أفضل من فقه في الدين و لفقيه واحد أشد علي الشيطان من ألف عابد و لكل شيء عماد و عماد هذا الدين الفقه

Allaha (subhanəhu və təalə) din xüsusunda elm sahibi olmaqdan daha üstün bir şeylə ibadət edilməmişdir. Şeytan üçün bir fəqihi aldatmaq, min abidi aldatmaqdan daha çətindir. Hər binanın bir dirəyi vardır. Bu dinin dirəyi də elmdir.[49]

خير دينكم أيسره و خير العبادة الفقه

Dininizin ən xeyirli tərəfi ən asan olanıdır. İbadətlərin ən xeyirlisi isə elmdir.[50]

[46] Əbu Davud, Tirmizi, Nəsai və İbni Hibban.
[47] İbni Məcə, Osmandan rəvayət etmişdir.
[48] İhyau Ulumi-d Din, c. 1, səh. 6.
[49] Təbərani, Əbu Bəkr əl Acuri və Əbu Nueym Əbu Hureyradan rəvayət etmişlərdir.
[50] İbni Əbdulbərr, Ənəsdən rəvayət etmişdir.

فضل المؤمن العلم على المؤمن العابد بسبعين درجة

Alim olan mömin, abid olan mömindən yetmiş dərəcə daha fəzilətlidir.[51]

انكم اصبحتم في زمن كثير فقهاؤه قليل قراؤه و خطباؤه قليل سألوه كثير معطوه العمل فيه خير من العلم و سيأتي على الناس زمان قليل فقهاؤه كثير خطباؤه قليل معطوه كثير سائلوه العلم فيه خير من العمل

Ey Əshabım! Sizlər fəqihlərin çox, qurra və xətiblərin az, elm sahiblərinin çox, sual soruşanların isə az olduğu bir zamanda yaşıyırsınız. Bu zamanda əməl elmdən daha xeyirlidir. Fəqət insanların üzərinə elə bir zaman gələcəkdir ki, fəqihlər az, qurra və xətiblər çox, elm sahibləri az, sual verənlər isə çox olacaqdır. O zamanda elm əməldən daha xeyirli olacaqdır.[52]

بين العالم و العابد مائة درجة بين كل درجتين حضر الجواب المضمر سبعين سنة

Alim ilə abid arasında yüz dərəcə fərq vardır. Hər dərəcənin arasında yetmiş illik bir məsafə vardır.[53]

و قيل: يا رسول الله أي الاعمال أفضل؟ فقال: العلم بالله عز و جل، فقيل:أي العلم تريد؟ فقال: العلم بالله سبحانه، فقيل: نسأل عن العمل و تجيب عن العلم، فقال: إن قليل عمل ينفع مع العلم بالله، و إن كثير العمل لا ينفع مع الجهل بالله

Rəsulullaha əməllərinin hansının daha üstün və fəzilətli olduğu soruşulanda, Əziz və Cəlil olan Allahı bilməkdir deyə cavab verdi. Hansı biliyi nəzərdə tutduğunu soruşduqda isə nöqsan sifətlərdən münəzzəh olan Allahı bilməyi qəsd edirəm dedi. Onlar: Ey Allahın Rəsulu biz əməldən soruşuruq, siz isə elmdən xəbər verirsiz dedilər. Bunun üzərinə Allah Rəsulu (səllallahu aleyhi və səlləm) dedi: Allahı bilərək

[51] İbn Adiy, Əbu Hureyradan rəvayət etmişdir.
[52] Təbərani, Huzam bin Hakimdən rəvayət etmişdir.
[53] İsfəhani Tərğib və Tərhibdə, Abdullah bin Amrdan; Deyləmi isə Müsnədu-l Firdəvsdə Əbu Hureyradan rəvayət etmişdir.

qazanılan elm nə qədər az olarsa olsun insana fayda verər. Allahı bilmədən edilən əməllər isə insana heç bir fayda verməz.[54]

يبعث الله سبجانه العباد يوم القيامة ثم يبعث العلماء ثم يقول: يا معشر العلماء، إني لم اضع علمي فيكم إلا لعلمي بكم و لم أضع علمي فيكم لأعذبكم، اذهبوا فقد غفرت لكم

Allah (subhənəhu və təalə) Qiyamət günündə bütün qullarını dirildib məhşərə gətirdikdən sonra alimlərində dirildib onlara belə xitab edər: Ey alimlər zümrəsi! Sizi yaxşı bildiyim üçün elmi sizə verdim, əzab etmək üçün deyil. O halda nemətlərə qaçın! Hamınızı əfv etdim.[55]

Zikredilən hədislər elmin fəziləti üçün kifayətdir. Elmin fəziləti əslən çox uzun mövzudur. Sünnədən çoxlu dəlil ilə mövzunu bəzəmək mümkündür. Ancaq bu qədər Hədis ilə kifayətlənməyi daha uyğun bildim. Çünki məqsədim məsələni, oxucuları nəzərə alaraq xülasə olaraq çatdırmaqdır.

[54] İbni Əbdulbərr Ənəsdən rəvayət etmişdir.
[55] Təbərani Əbu Musadan rəvayət etmişdir.

## ELMİN FƏZİLƏTİ İLƏ ƏLAQƏLİ ƏSHABIN VƏ ALİMLƏRİN SÖZLƏRİ

قال عَلِيُّ بْنُ أَبِي طَالِبٍ رَضِيَ اللَّهُ عَنْهُ لكميل يا كميل العلم خير من المال العلم يحرسك وأنت تحرس المال والعلم حاكم والمال محكوم عليه والمال تنقصه النفقة والعلم يزكو بالإنفاق

Əli (radiyallahu anhu) tələbəsi olan Kumeylə belə demişdir: “Ey Kumeyl elm maldan daha xeyirlidir. Çünki elm səni qoruyar. Malı isə sən qoruyarsan. Elm hakim, mal isə məhkumdur. Mal xərcləməklə azalar, elm isə xərcləməklə artar.”

وقال علي أيضاً رضي الله عنه العالم أفضل من الصائم القائم المجاهد وإذا مات العالم ثلم في الإسلام ثلمة لا يسدها إلا خلف منه

Yenə Əli (radiyallahu anhu) belə demişdir: “Alim, gündüzləri daima oruc tutan, gecələri isə ibadət edib bütün zamanını cihada xərcləyən birindən daha üstündür. Alimin ölümü ilə açılan boşluğu ancaq onun səviyəsindəki başqa bir alim doldura bilər.”

وقال رضي الله عنه نظماً
ما الفخر إلا لأهل العلم إنهم ... على الهدى لمن استهدى أدلاء
وقدر كل امرىء ما كان يحسنه ... والجاهلون لأهل العلم أعداء
ففز بعلم تعش حياً به أبداً ... الناس موتى وأهل العلم أحياء

Əli (radiyallahu anhu) bir mənzuməsində belə demişdir:
- Bədənləri cəhətdən insanlar bir-birləri ilə eynidir.
- Anaları Həvva ataları Adəmdir.
- Soylarında iftixar vəsiləsi axtarırlarsa bilsinlər ki, əsilləri palçıq və sudan ibarətdir.
- Alimlər, axtaranlara hidayət vəsiləsidir.
- Hər insanın qiyməti elmi ilə bilinər.
- Cahillərdir alimlərin ən amansız düşmənləri.
- Sən elm əldə etməyə bax və harada istifadə edəcəyini bil.
- Bütün insanlar ölərlər ancaq alimlər diridirlər.

وقال أبو الأسود ليس شيء أعز من العلم الملوك حكام على الناس والعلماء حكام على الملوك

Əbu Əsvəd əd Duəli (Hz. Əlinin tələbəsidir. Ərəb dili qrammatikasının qurucusu olaraq bilinir. Hicri 169-cı ildə vəfat etmişdir.) demişdir: “Dünyada elmdən daha üstün və daha əziz bir şey yoxdur. Çünki sultanlar xalqa hökm edərlərkən alimlər də sultanlara hökm edərlər.”

وقال ابن عباس رضي الله عنهما خير سليمان بن داود عليهما السلام بين العلم والمال والملك فاختار العلم فأعطي المال والملك معه

İbni Abbas (radiyallahu anhu) belə demişdir: “Süleymana (əleyhissələm) elm, mal və səltənət arasında istədiyini seçmək haqqı verildiyində, O elmi seçdi. Buna görədə Allah (subhənəhu və təalə) Ona malıda, səltənətidə verdi.”

وسئل ابن المبارك من الناس فقال العلماء قيل فمن الملوك قال الزهاد قيل فمن السفلة قال الذين يأكلون الدنيا بالدين

İbni Mübarəkə kamil insanların kimlər olduğu soruşulduqda alimlər deyə cavab vermiş, həqiqi sultanların kimlər olduğu soruşulduqda isə zahidlər demişdir. Ən alçaq insanların kimlər olduğu soruşulduqda isə dinlərini sataraq dünyalıq qazananlardır cavabını vermişdir.

ولم يجعل غير العالم من الناس لأن الخاصية التي يتميز بها الناس عن سائر البهائم هو العلم فالإنسان إنسان بما هو شريف لأجله وليس ذلك بقوة شخصه فإن الجمل أقوى منه ولا بعظمه فإن الفيل أعظم منه ولا بشجاعته فإن السبع أشجع منه ولا بأكله فإن الثور أوسع بطناً منه ولا ليجامع فإن أخس العصافير أقوى على السفاد منه بل لم يخلق إلا للعلم

Diqqət ediləcək olarsa İbni Mübarək, alimlərdən başqasını kamil insan mərtəbəsinə aid etmir. Çünki insanı heyvandan ayıran xüsusiyyət sadəcə elmdir. İnsan, ona şərəf qazandıran vəsfi ilə ancaq insan sayıla bilər. İnsanın şərəfi qüvvətindən gəlməz. Elə olsaydı dəvələrin daha üstün olması lazım olardı. Çünki dəvələr insanlardan daha güclüdürlər. Cüssəsinin böyüklüyündəndə deyillər. Fillər insanlardan daha cüssəlidirlər. İnsanın şərəfi cəsur olmasındanda qaynaqlanmaz. Meşələrdəki yırtıcı heyvanlar insanlardan daha cəsarətlidirlər. Çox

yemək yeməsindəndə deyildir. Elə olsa idi öküzlərin daha şərəfli olması gərəkərdi. Eyni ilə çox cinsi münasibətdə olmasındanda deyildir. Kiçik bir quş belə cinsi qüdrət baxımından insan oğlundan daha güclüdür. Qısaca bunların heç biri insana şərəf verməz. İnsana şərəf verən şey sadəcə elmdir.

وقال بعض العلماء ليت شعري أي شيء أدرك من فاته العلم وأي شيء فاته من أدرك العلم

Bəziləri belə demişlərdir: "Elmi əlindən qaçıranın nə qazandığını, elmi əldə edənin də nə qaçıracağını bir bilsəydim!"

وقال عليه الصلاة والسلام من أوتي القرآن فرأى أن أحداً أوتي خيراً منه فقد حقر ما عظم الله تعالى

Allah Rəsulu (səllallahu aleyhi və səlləm) belə buyurmuşdur: "Quran bilgisinə sahib olan birisi, başqasının maddi sərvətini daha xeyirli görərsə Allahın böyük gördüyünü kiçik görmüş olar."

وَقَالَ فتح الموصلي رَحِمَهُ اللَّهُ أَلَيْسَ الْمَرِيضُ إِذَا مُنِعَ الطَّعَامَ وَالشَّرَابَ وَالدَّوَاءَ يَمُوتُ قَالُوا بَلَى قَالَ كَذَلِكَ الْقَلْبُ إِذَا مُنِعَ عَنْهُ الْحِكْمَةُ وَالْعِلْمُ ثَلَاثَةَ أَيَّامٍ يَمُوتُ

Əbu Muhamməd Fəth bin Said əl Məvsili belə demişdir: "Xəstə yemək, içmək və müalicə edilməkdən mən edilərsə ölməzmi? Əlbətdə ölər. Qəlb də həmçinin bir xəstə kimi üç gün ard - arda elm və hikmətdən məhrum qalarsa mənən ölər."

وَلَقَدْ صَدَقَ فَإِنَّ غِذَاءَ الْقَلْبِ الْعِلْمُ وَالْحِكْمَةُ وَبِهِمَا حَيَاتُهُ كَمَا أَنَّ غِذَاءَ الْجَسَدِ الطَّعَامُ وَمَنْ فَقَدَ الْعِلْمَ فَقَلْبُهُ مَرِيضٌ وَمَوْتُهُ لَازِمٌ وَلَكِنَّهُ لَا يشعر به إذ حب الدنيا وشغله بها أبطل إحساسه كما أن غلبة الخوف قد تبطل ألم الجراح في الحال وإن كان واقعاً فإذا حط الموت عنه أعباء الدنيا أحسن بهلاكه وتحسر تحسراً عظيماً ثم لا ينفعه وذلك كإحساس الآمن خوفه والمفيق من سكره بما أصابه من الجراحات في حالة السكر أو الخوف فَنَعُوذُ بِاللَّهِ مِنْ يَوْمِ كَشْفِ الْغِطَاءِ فَإِنَّ الناس نيام فإذا ماتوا انتبهوا

Fəth bin Said əl Məvsili necədə doğru demişdir: "Həqiqətəndə qəlbin qidası elm və hikmətdir. Eyni ilə bədənin yaşamasının qidaya bağlı

olması kimi qəlbin yaşamasıda elm və hikmətə bağlıdır. Elmdən yoxsun olanların qəlbi həm xəstədir həm də ölüdür. Üstəlik dünya sevgisi ilə mal düşkünlüyü elmsiz birini elə bir hala gətirər ki, bütün hisslərini qaraldar. Qorxunun, yaranın ağrısını müvəqqəti olaraq əngəlləməsi kimi, o insan da içində olduğu fəlakətin fərqində olmaz. Elmsiz insanların halı belədir. Fəqət ölüm gəldiyində və dünya yükünü kürəyindən aldığında, insan o zaman fəlakətdə olduğunu anlayar və həddindən artıq mütəəssir olar. Necə ki, sərxoşkən və qorxu içində ikən aldığı yaralardan acı hissetməyən bir insanın, ayıldıqdan və ya qorxudan qurtulduqdan sonra yaralardan hissetdiyi acı kimi… Amma onların peşmanlıqları özlərinə fayda verməz. Pərdələri qaldıran günün dəhşətindən Allaha (subhənəhu və təalə) sığınırıq! İnsanoğlu yuxudadır ancaq öldükdən sonra oyanar. Daha öncə etdiklərinin qarşılığını görər, ancaq iş işdən keçmişdir artıq!”

وقال الحسن رحمه الله يوزن مداد العلماء بدم الشهداء فيرجح مداد العلماء بدم الشهداء

Həsən Bəsri (rahiməhullah) belə demişdir: “Alimlərin qələmindən damcılayan mürəkkəb, şəhidlərin qanı ilə ölçülər və mürəkkəb qandan daha ağır gələr.”

وَقَالَ ابْنُ مَسْعُودٍ رَضِيَ اللَّهُ عَنْهُ عَلَيْكُمْ بِالْعِلْمِ قَبْلَ أَنْ يُرْفَعَ وَرَفْعُهُ مَوْتُ رُوَاتِهِ فوالذي نفسي بيده ليودن رجال قتلوا في سبيل الله شهداء أن يبعثهم الله علماء لما يرون من كرامتهم فإن أَحَدًا لَمْ يُولَدْ عَالِمًا وَإِنَّمَا الْعِلْمُ بِالتَّعَلُّمِ

İbni Məsud (radiyallahu anhu) belə demişdir: “Elm büsbütün çəkilmədən öncə ona sarılın. Elm ancaq alimlərin vəfatı ilə ortadan qalxar. Nəfsimi qüdrət əlində tutan Allaha and olsun ki, Allah yolunda şəhid olan kimsələr, alimlərin axirətdəki mərtəbələrini gördüklərində, Allahdan (subhənəhu və təalə) onları təkrar dirildib alim etməsini istəyərlər. Heç kimsə anasından alim olaraq doğulmaz. Elm ancaq çalışıb öyrənməklə əldə edilər.”

وقال ابن عباس رضي الله عنهما تذاكر العلم بعض ليلة أحب إلي من إحيائها

İbni Abbas (radiyallahu anhu) belə demişdir: “Mənə gecənin bir qismini elmə ayırmaq, bütün gecəni ibadətlə keçirməkdən daha sevimlidir.”

وقال الحسن في قوله تعالى {رَبَّنَا آتِنَا فِي الدُّنْيَا حَسَنَةً وَفِي الْآخِرَةِ حسنة} إن الحسنة في الدنيا هي العلم والعبادة وفي الآخرة هي الجنة

Həsən Bəsri - “Ey Rəbbimiz! Bizə dünyada da gözəllik ver, axirətdə də gözəllik ver! Bizi cəhənnəm əzabından qoru![56] ayəsinin təfsirində demişdir: “Bu ayədə keçən dünyadaki gözəllik, elm və ibadəti əhatə edir. Axirətdəki gözəllik isə cənnətdir.”

وقيل لبعض الحكماء أي الأشياء تقتنى قال الأشياء التي إذا غرقت سفينتك سبحت معك يعني العلم وقيل أراد بغرق السفينة هلاك بدنه بالموت

Hikmət əhlindən bir zata “Bu dünyada nəyi sərmayə edinmək daha karlıdır?” deyə soruşulduqda o, (elmi nəzərdə tutaraq), gəmi batanda səninlə qalan şeyi sərmayə edin demişdir. Gəminin batması insanın ölümü, onunla qalacaq sərmayə isə elmdir.”

وقال بعضهم من اتخذ الحكمة لجاماً اتخذه الناس إماماً ومن عرف بالحكمة لاحظته العيون بالوقار

Bəzi alimlər də belə demişlərdir: “Hikmətli olanı, xalq özünə rəhbər edər. Hikməti, vüqarlığı ilə tanınan birisinə isə bütün insanlar təzim və hörmət edərlər.”

وقال الشافعي رحمة الله عليه من شرف العلم أن كل من نسب إليه ولو في شيء حقير فرح ومن رفع عنه حزن

İmam Şafi (rahiməhullah) deyir ki: “Elmin xüsusiyyətlərindəndir ki, az da olsa ondan payı olanlar sevinərlər, olmayanlar isə hüzünlü olarlar.”

---

[56] Bəqərə 201

وقال عمر رضي الله عنه يا أيها الناس عليكم بالعلم فإن لله سبحانه رداء يحبه فمن طلب باباً من العلم رداه الله عز وجل بردائه فإن أذنب ذنباً استعتبه ثلاث مرات لئلا يسلبه رداءه ذلك وإن تطاول به ذلك الذنب حتى يموت

Ömər (radiyallahu anhu) belə demişdir: "Ey İnsanlar! Elmi tələb edib öyrənin! Çünki Allahın (subhənəhu və təalə) çox sevdiyi bir libas vardır və o libası elmi axtaran və axtardığını tapan kimsələrə geyindirər. Həmin şəxs libas üzərində ikən günah işləsə, Allah (subhənəhu və təalə) o paltarı üzərindən çıxarmamaq üçün ona üç dəfə tövbə etməsi üçün möhlət verər."

وقال الأحنف رحمه الله كاد العلماء أن يكونوا أرباباً وكل عز لم يوطد بعلم فإلى ذل مصيره

Əbu Bəkr əl Əhnəf bin Qays bin Muaviyə demişdir: "Alimlərin hamısı az qalsın məlik olacaqlardı. Elimlə qüvvətləndirilməmiş bütün izzətlərin sonu zillətdən başqa bir şey deyildir."

وقال سالم بن أبي الجعد اشتراني مولاي بثلثمائة درهم وأعتقني فقلت بأي شيء أحترف فاحترفت بالعلم فما تمت لي سنة حتى أتاني أمير المدينة زائراً فلم آذن له

Səlim bin Əbul Cəd dedi: "Əfəndim məni üç yüz dirhəmə aldı və sonra da azad etdi. Azad olduqdan sonra elimlə məşğul olmağa qərar verdim. Aradan uzun zaman keçmədən yaşadığım şəhərin valisi məni ziyarətə gəldi. Ancaq mən müsait olmadığım üçün onunla görüşməmişdim.

وقال الزبير بن أبي بكر كتب إلي أبي بالعراق عليك بالعلم فإنك إن افتقرت كان لك مالاً وإن استغنيت كان لك جمالاً

Zubeyr bin Əbi Bəkr dedi: "Atam mənə İraqdan yazdığı bir məktubunda Oğlum elm öyrən! Elm fəqirliyində sənin üçün ən qiymətli maldır. Zənginliyində isə sənin üçün zinətdir deyirdi."

وحكى ذلك في وصايا لقمان لابنه قال يَا بُنَيَّ جَالِسِ الْعُلَمَاءَ وَزَاحِمْهُمْ بِرُكْبَتَيْكَ فَإِنَّ اللَّهَ سُبْحَانَهُ يُحْيِي الْقُلُوبَ بِنُورِ الْحِكْمَةِ كَمَا يحيي الأرض بوابل السماء

Loğman (əleyhissələm) oğluna belə nəsihət etmişdi: “Ey oğul! Alimlərlə bərabər ol! Yer üzünü yağış ilə dirildən Allah, insan oğlunun qəlbini də elimlə dirildib yaşadar.”

وقال بعض الحكماء إذا مات العالم بكاه الحوت في الماء والطير في الهواء ويفقد وجهه ولا ينسى ذكره

Elm əhlindən biri belə demişdir: “Alim öldüyü zaman sudakı balıqlardan havadakı quşlara qədər bütün canlılar ağlayar. Həqiqətən ölən alimin sadəcə üzü unudular ancaq özü heç zaman unudulmaz.”

وقال الزهري رحمه الله العلم ذكر ولا تحبه إلا ذكران الرجال

Zuhri (rahiməhullah) belə demişdir: “Elm sözü müzəkkərdir. Onu ancaq kişilər sevər.” [57]

[57] İhyau Ulumi-d Din, c. 1, səh. 7-8.

## ELMİN FƏZİLƏTİ HAQQINDA FAYDALAR

- Elm sahibini uca Allah öz isminin və mələklərinin isminin yanında zikretmişdir.
- Elm insanı ucaldar və şərəfləndirər.
- Elm insanın mərtəbəsini və dərəcəsini ucaldar.
- Elm insanı məlumatı olanlar mərtəbəsində hörmətlilərdən edər.
- Elm insana Allah qorxusu verər.
- Elm insanı ədalət sahibi edər.
- Elm insanı saleh əmələ aparar.
- Axirətin qiyməti ancaq elm ilə bilinər.
- İnsanın təqva libası elmdir.
- Elm sinələrdə əzbər olan açıq aydın ayələrdir.
- Elm və fəqihlik Allahın bəndəsi üçün xeyir murad etməsidir.
- Elm sahibləri Peyğəmbərlərin varisləridir.
- Yerdə və göydə olanlar elm sahiblərinin bağışlanması - üçün istiğfar edər.
- Elm köləları sultanların səviyyəsinə yüksəldər.
- İman lütfdür,meycəsi isə elmdir.
- Uca Allah elm sahibini qoruyar və ona unmadığı yerdən ruzi verər.
- Uca Allah alim olan qulları sevər.
- Alimin islahı ümmətin islahıdır.
- Alimin Abidə üstünlüyü ayın ulduzlara olan üstünlüyü kimidir.
- Qiyamət günü şəfaət edəcək üç sinifdən biri alimlərdir.
- Allaha ibadətin ən mükəmməli elmlə olanıdır.